# Pedaqoji təhsilin məzmun və səviyyəsinə qoyulan minimum tələblərin kadr hazırlığının təşkilində nəzərə alınması

**Afət Süleymanova**

**Müəllif:**
Afət Süleymanova — Azərbaycan Respublikası Təhsil Nazirliyinin aparıcı məsləhətçisi, pedaqogika üzrə fəlsəfə doktoru.
E-mail: a.suleymanova@edu.gov.az

**Açar sözlər:**
pedaqoji təhsil, minimum tələb, məzmun və səviyyə, kadr hazırlığı.

**Annotasiya.** Tədqiqatda Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasının beş istiqamətindən biri olan «Təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksək nüfuzlu təhsilverənin formalaşdırılması»ndan irəli gələn hədəflərin həyata keçirilməsi vəziyyəti öyrənilmişdir. Bunun üçün statistik göstəricilər təhlil edilmiş, pedaqoji təhsilin təşkilinə dair hüquqi-normativ sənədlər və elmi ədəbiyyatlar araşdırılmışdır. Ali təhsil üzrə Dövlət Standartı, Bakalavriat səviyyəsinin ixtisas üzrə Təhsil Proqramında təsbit edilmiş təhsilin məzmun və səviyyəsinə qoyulan minimum tələblər («İbtidai sinif müəllimliyi» ixtisası nümunəsində) pedaqoji kadr hazırlığı ilə məşğul olan ali təhsil müəssisəsinin sənədləri ilə (Azərbaycan Dövlət Pedaqoji Universitetinin nümunəsində) qarşılaşdırılmış və təhlil edilmişdir. Pedaqoji təhsilin məzmun və səviyyəsinə qoyulan minimum tələblərin reallaşdırılmasına mane olan səbəblər müəyyən edilmiş və nəticəyönlü planlaşmanın aparılması, sillabusların nəticəyönlülüyünün təmin olunması, tərtibi texnologiyaları və pedaqoji təhsilin mərhələli və sistemli təşkilinə dair təkliflər verilmişdir.

**DOI:**
**Məqaləyə istinad:** Afət Süleymanova. Pedaqoji təhsilin məzmun və səviyyəsinə qoyulan minimum tələblərin kadr hazırlığının təşkilində nəzərə alınması. *«Azərbaycan məktəbi» jurnalı.* № 2, 2018. səh. 19–39

**Məqalə tarixçəsi**
Göndərilib: 12.07.2018; Qəbul edilib: 12.09.2018; Nəşr edilib:

# Minimum requirements for the content and level of pedagogical education and the state of their implementation

**Afet Suleymanova**

**Author:**
Afet Suleymanova,
Leading Advisor of the Ministry of Education of Azerbaijan Republic,
PhD on the pedagogical sciences. a.suleymanova@edu.gov.az

**Keywords:**
pedagogical education, a minimum requirement, content and level.

**Abstract.** The study examined the condition of the creating of an influential educator which comes from the objectives of the State Strategy for Education Development in the Republic of Azerbaijan. For this purpose it analyzed statistical indicators, were studied legal-normative documents on the organization of pedagogical education and scientific literature. The State Standard for Higher Education and the minimum requirements for the content of education of Bachelor's Degree in the specialty «Primary Classroom Teacher» have been met by the documents of the higher education institution engaged in pedagogical personnel training (in the example of the Azerbaijan State Pedagogical University) and comparatively analyzed. The reasons prevented the implementation of the minimum requirements for the content and level of pedagogical education were identified, and given suggestions on result-oriented planning, results based syllabus development technologies and step-by-step and systematic organization of pedagogical education.

**DOI:**
**To cite this article:** Afet Suleymanova. Minimum requirements for the content and level of pedagogical education and the state of their implementation. *Azerbaijan Journal of Educational Studies.* No2, 2018. pp. 19–39

**Article history**
Received: 12.07.2018; Accepted: 12.09.2018; Published:

«Təhsil sisteminin keyfiyyəti onun müəlliminin keyfiyyətindən üstün ola bilməz».
*(Maykl Barber, professor, beynəlxalq təhsil tədqiqatları üzrə ekspert)*

## Giriş

Təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksək nüfuzlu təhsilverənin formalaşdırılmasından irəli gələn hədəflər pedaqoji təhsilin qarşısına aydın vəzifələr qoymuşdur. Azərbaycan Respublikası Təhsil Nazirliyinin 22 avqust 2014-cü il tarixli 913 nömrəli əmri ilə Ali təhsil pilləsinin dövlət standartı və bakalavriat səviyyəsinin müxtəlif ixtisasları üzrə təhsil proqramlarında təhsilin məzmununa və səviyyəsinə qoyulan minimum tələblər təsdiq edilmişdir. Qeyd edilən minimum tələblərin tətbiqi vəziyyətini öyrənmək üçün çoxşaxəli tədqiqatlar aparılmışdır. «Ali təhsil müəssisələrini 2013-2017-ci illərdə bitirən məzunların 2017-ci il müəllimlərin işə qəbulu müsabiqəsi üzrə göstəriciləri» araşdırılmışdır. «Təhsil haqqında» Azərbaycan Respublikasının Qanunu, Azərbaycan Respublikasında təhsilin İnkişafı üzrə Dövlət Strategiyası və Strategiyanın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı, Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının Konsepsiya və Strategiyası, ali təhsil pilləsinin dövlət standartı və proqramı, ümumi təhsil pilləsinin dövlət standartları və proqramları, bakalavriat səviyyəsinin ixtisas üzrə proqramı (ibtidai sinif müəllimliyi ixtisası), bakalavriat təhsilinin məzmunu və təşkili qaydaları, ali təhsil müəssisələrinin bakalavriat və magistratura səviyyələrində kredit sistemi ilə tədrisin təşkili qaydaları, ali və orta ixtisas təhsil müəssisələrinin attestasiyası və akkreditasiyası haqqında əsasnamə, təhsil sahəsinə aid olan qulluqçu vəzifələrinin vahid tarif-ixtisas sorğu kitabçası, müəllimlərin etik davranış qaydaları kimi hüquqi-normativ sənədlər baxımından pedaqoji təhsilin təşkilinin müxtəlif məqamları araşdırılmışdır. Adları qeyd edilən hüquqi-normativ sənədlərdə müəllim hazırlığı, müəllim şəxsiyyəti ilə bağlı önə çəkilən məsələlər öyrənilmiş və təhsil proqramları həmin tələblər baxımından təhlil edilmişdir. Mövcud vəziyyət elmi ədəbiyyatdan müəyyən edilmiş tapıntılarla əlaqələndirilmiş və dəyərləndirilmişdir.

2002-ci ildə təhsil sahəsində İslahat Proqramının «Pedaqoji təhsil, ixtisasartırma və yenidənhazırlanma» komponenti çərçivəsində araşdırmalar aparmış beynəlxalq məsləhətçi Rob Mak Braydın «Yekun hesabat»ında göstərdiyi pedaqoji təhsilin problemləri nəzərdən keçirilmiş, mövcud vəziyyətlə əlaqələndirilmişdir.

Müəyyən edilmişdir ki, Təhsil Nazirliyi tərəfindən 5 il müddətində keçirilmiş işə qəbul imtahanlarında pedaqoji kadr hazırlığı ilə məşğul olan ali təhsil müəssisələrinin 15427 məzununun 2589-u (17,5%-i) 48 və daha artıq bal toplaya bilmişlər. 36 və daha artıq bal toplayanların sayı isə 9495-ə çatmışdır. Bu da müraciət edənlərin 65,36 faizini təşkil edir. Belə qənaətə gəlmək olar ki, işə qəbul müraciəti edən məzunların böyük əksəriyyəti (82,85%) 48-dən aşağı, əhəmiyyətli çoxluğu isə (34,64%) 36-dan aşağı bal toplamışdır. Deməli, beş il ərzində müəllim olmaq arzusu ifadə edən ixtisaslı mütəxəssislərin böyük çoxluğu Təhsil Nazirliyi tərəfindən təsdiq edilmiş məzmun və səviyyəyə qoyulan minimum tələblərə cavab verməmişdir. Bu da belə qənaətə gəlməyə əsas verir ki, pedaqoji kadr hazırlığı ilə məşğul olan ali təhsil müəssisələrində pedaqoji təhsilin məzmun və texnologiyalarının təşkili və planlaşdırılması üzərinə islahatlar sürətləndirilməlidir.

Tədqiqatın məqsədi pedaqoji təhsilin məzmununa və səviyyəsinə qoyulan minimum tələblərin reallaşmasına mane olan səbəblərin öyrənilməsidir.

## Metodologiya

Tədqiqatlar əlaqəli olan iki istiqamətdə aparılmışdır:

1. Milli səviyyədə pedaqoji kadr hazırlığına və pedaqoji təhsilin təşkilinə verilən tələblərin reallaşdırılması imkanlarını araşdırmaq məqsədi ilə hüquqi normativ sənədlərin, tədris proqramları, tədris planları və işçi tədris proqramlarının ümumidən xüsusiyə doğru əlaqəlilik, davamlılıq və ardıcıllığın gözlənilməsi ilə tətbiqinin təşkili vəziyyətinin təhlili;

2. XXI əsr kompetensiyaları və milli səviyyədə pedaqoji təhsillə birbaşa və dolayısı ilə bağlı olan sənədlərin onlarla uyğunluq səviyyəsinin öyrənilməsi.

Nəzərədə tutulan araşdırmaları aparmaq üçün aşağıda qeyd edilən metodlardan istifadə edilmişdir:

• *Masaüstü tədqiqatlar:* Hüquqi-normativ sənədlərin, elmi ədəbiyyatın öyrənilməsi, təhlili, əlaqələndirilməsi, nəticələrin çıxarılması.

• *Kəmiyyət tədqiqatları:* sorğunun aparılması, nəticələrin təhlili.

• *Təcrübə:* Minimum tələblərin reallaşdırılmasına xidmət edən fənlər üzrə işçi-tədris proqramlarının (sillabus) hazırlanması üçün müvafiq təlim materialı hazırlanmış və ADPU-nun 19 müəlliminə təlim məşğələsi keçirilmişdir.

Hadisənin araşdırılması, analitik induksiya, məqsədli söhbət və digər metodlardan istifadə edilmişdir.

## Nəticələrin təhlili

Gələcəkdə siyasi, sosial, mədəni və iqtisadi sektorların inkişafı bugünkü məktəblərimizin səviyyəsindən asılıdır [YUNESKO, 1991]. Hər bir ölkədə təhsilin keyfiyyəti, əsasən, onun müəllim ordusunun keyfiyyətindən qaynaqlanır. Odur ki, müəllim təhsilinin keyfiyyətini yüksəltməklə tədris və təlimin keyfiyyətinin yüksəldilməsində sıçrayışa nail omaq mümkündür [YUNESKO, 2013].

***Azərbaycanda pedaqoji təhsilin keyfiyyətinin yüksəldilməsi məsələsi*** təhsil islahatlarının bütün mərhələlərində aktual olaraq qalmışdır. Hələ 2002-ci ildə Təhsil Sektorunun İnkişafı Layihəsi çərçivəsində «Müəllim hazırlığı» (pedaqoji təhsil, ixtisasartırma və yenidənhazırlanma) komponenti üzrə təhlillər aparmış beynəlxalq məsləhətçi Rob Mak Brayd «Yekun hesabat»ında mövcud problemə bir neçə istiqamətdən nəzər salmışdır : a) pedaqoji təhsil proqramının təşkili; b) ali təhsil müəssisələrində professor-müəllim heyətinin səviyyəsi; c) müəllim hazırlığı ilə məşğul olanlarla ümumi təhsil müəssisələrinin müəllimləri arasında əlaqə.

Hesabatda ***pedaqoji təhsil proqramının təşkilinə dair*** aşağıda qeyd edilən problemlər diqqətə çatdırılmışdır:

• Ali təhsil müəssisələrində fənn üzrə nəzəri biliklərin təlim və tədris prosesində əhəmiyyəti lazımı dərəcədən artıq qiymətləndirilir;

• Ali təhsil müəssisələrində təhsilin öyrənilməsində, məktəblərin tədqiqindən daha çox psixoloji, metodoloji və pedaqoji nəzəriyyələrin qurulmasına üstünlük verilir;

• Ali təhsil müəssisələrində pedaqoji təhsil alan tələbələrin ümumtəhsil məktəblərində təcrübə keçməsinə lazımınca diqqət yetirilmir;

Ali təhsil müssisələrində ***professor-müəllim heyətinin səviyyəsinə dair*** aşkar edilmiş problemlər beynəlxalq məsləhətçinin hesabatında bu şəkildə ifadə edilir:

• Ali təhsil müəssisələrində dəyişikliklərin aparılması və yeniliklərin tətbiq olunması ilə məşğul ola biləcək xüsusi hazırlıqlı insanlar azdır;

• Ali təhsil müəssisələri məktəblərdə tədqiqatlar aparmadığından ali məktəb müəllimləri məktəb haqqında tam təsəvvür əldə edə bilmir, buna görə də onlar ümumtəhsil məktəblərinin müəllimləri ilə əməkdaşlıq edə bilmirlər;

Müəllim hazırlığı ilə məşğul olanlarla ***ümumi təhsil müəssisələrinin müəllimləri arasında əlaqənin vəziyyətini*** öyrənən məsləhətçilər aşağıdakı boşluqları diqqətə çatdırmışdır.

• Ali təhsil müəssisələri heyətinin ümumtəhsil məktəblərində əsaslı tədqiqatlar aparmasını sübut edən dəlillər azdır;

• Ali təhsil müəssisələrində müəllim hazırlığı ilə məşğul olanların ümumtəhsil məktəblərində

təlim və tədris proseslərinin real vəziyyəti barədə məlumatı azdır;

2002-ci ildə aradan qaldırılması tövsiyə edilən nöqsanların günümüzdə öz aktuallığını hansı səviyyədə qoruyub saxladığını, hansı məsələlərin həllinə nail olunduğuna nəzər salmaq əhəmiyyətli hesab edilir. Bu müddət ərzində pedaqoji təhsildə aparılan islahatlar günün müəllim hazırlığı tələblərinə nə qədər cavab verir? XXI əsrin vətəndaşı hansı bilik, bacarıq, vərdiş və dəyərlərə sahib olmalıdır? Məktəblərdə fəaliyyət göstərən təhsil işçiləri hansı kompetensiyalara malik olmaldırlar ki, öz rifahını təmin edib, icmasının da rifahına töhfələr verə bilən şəxsiyyəti, vətəndaşı formalaşdırmaq kimi vəzifəni yerinə yetirməyə qadir olsunlar? Bu suallar, qloballaşan dünyamızda böyük və kiçik xalqların ictimai, siyasi, iqtisadi rifahını təmin etmək üçün siyasət quranları, onu icra edənləri, iqtisadçıları, sahibkarları, işaxtaranları və işlə təmin edənləri düşündürməlidir. Qeyd edilən məsələləri aydınlaşdırmaq məqsədi ilə pedaqoji təhsilin siyasətini müəyyən edən hüquqi-normativ sənədlər tərəfimizdən araşdırılmışdır. Birbaşa və ya dolayısı ilə müəllim hazırlığının keyfiyyət göstəricilərini ifadə edən sənədlər əlaqəlilik, davamlılıq, ardıcıllıq prinsiplərindən çıxış edərək təhlil edilmişdir. Əsas sənəd olan «Təhsil haqqında» Azərbaycan Respublikasının Qanununda təsbit edilmiş «Təhsilin məzmunu və təşkilinə aid ümumi tələblər» həmin tələblərin reallaşdırılması məqsədilə yaradılmış digər sənədlərdəki keyfiyyət göstəriciləri ilə qarşılaşdırılmış, əlaqəlilik, davamlılıq vəziyyəti öyrənilmişdir (Cədvəl 1).

Təhsil Qanununda təhsilin məzmunu və təşklilinə dair müəyyən edilmiş «abstrakt siyasi niyyətlərin» təhsilin müxtəlif pillə və səviyyələrinin məqsəd və vəzifələrinə uyğun olaraq «konkret icra planına çevrilərək» [V.Hadad,1995] davam və inkişaf etdirildiyini qeyd etmək çətindir. Yuxarıda təqdim edilən nümunədə bəzən təsadüfi, bəzən fraqmental, bəzən də xaotik bir uyğunluq müşahidə edilir. Göründüyü kimi, təhsilin məzmunu və təşkilinə dair tələblərdə vurğulanan məsələlərin bir qismi bir sənəddə, digər qismi başqa sənəddə öz əksini tapmışdır. Nümunə olaraq «kollegial qərarların qəbul edilməsi» kimi bir bacarıq ardıcıllıq və davamlılıq gözlənilməklə növbəti mərhələlərdə spesifikləşdirilməkdən və müvafiq səviyyəyə uyğun inkişaf etdirilməkdənsə, bir sənəddə «prosesdə hər bir iştirakçının yerini görmək», digərində «kollektivdə işləmək», «kollektivdə öz həmkarları ilə birgə işləmək» kimi davam etdirilir. Bu da ilkin sənəddə verilən mahiyyəti nəinki inkişaf etdirərək davam etdirmir, əksinə, onun kiçik hissəciklərini əhatə edir. Bəzən də məsələləri davam etdirmək yerinə milli səviyyədə müəyyən edilmiş siyasi niyyət hər hansı səviyyə üçün də eynisi ilə qəbul edilir. Təhsilin ümumilikdə məzmunu və təşkili, ayrılıqda isə hər bir kompetensiyasının reallaşdırılması baxımından sistemlərarası və sistemdaxili, pillə və səviyyələrarası, eləcə də pillə və səviyyələrdaxili mükəmməl sistemli planlaşma təhsilin keyfiyyətinin yüksəldilməsinə zəmanət verir. Bu baxımdan «Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasının həyata kecirilməsi ilə bağlı Fəaliyyət Planı»nda «Təhsilin keyfiyyətinin təminatı üzrə yeni sistemin yaradılması» (3.3.) strateji hədəfi üzrə «təhsilin pillələri və səviyyələri üzrə keyfiyyət standartlarının və göstəricilərinin hazırlanması» (3.3.1) və «ömürboyu təhsil üzrə Milli Kvalifikasiya Çərçivəsi layihəsinin hazırlanması» (3.3.2.) kimi nəzərdə tutulmuş tədbirlər qeyd edilən boşluqların aradan qaldırılmasında müstəsna əhəmiyyət kəsb edir.

İş yerlərinin təbiəti və görünüşü dəyişdikcə, təhsilə olan tələbat və lazım olan kompetensiyalar da dəyişir [McLaughlin, 1995]. Bu gün təhsil hər zamankından daha çox gələcəyə istiqamətlənməlidir. Buna səbəb cazibədar elmi-texniki yeniliklər və dəyişikliklər, yeni-yeni sosial-siyasi islahatlar və heyranedici mədəni oyanışlardır [YUNESKO, 1991]. Dünyada baş verən elmi-texniki tərəqqi, qlobal səviyyədə baş verən ictimai, iqtisadi, ekoloji dəyişikliklər insanın həyata hazırlanması kimi həyatyüklü məsələlərə yenidən və fərqli müstəvidə baxılmasını tələb edir. Bu səbəbdən

Cədvəl 1. **«Təhsil haqqında Azərbaycan Respublikasının Qanununda təsbit edilmiş «Təhsilin məzmunu və təşkilinə aid ümumi tələblər»in davamlılıq ilə əlaqəlilik baxımından digər sənədlərdə ifadə edilməsi vəziyyəti.**

| «Təhsil haqqında» Azərbaycan Respublikasının Qanunu | Azərbaycan Respublika-sında təhsilin inkişafı üzrə Dövlət Strategiyası | Azərbaycan Respublika-sında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının Konsepsiya və Strategiyası | Ali təhsil pilləsinin dövlət standartı və proqramı | Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları | Bakalavriat təhsilinin məzmunu və təşkili Qaydaları | Bakalavriat səviyyəsinin ixtisas üzrə proqramı (ibtidai sinif müəllimliyi ixtisası) |
|---|---|---|---|---|---|---|
| – öz üzərinə məsulliyyət götürmək, kollegial qərarların qəbulunda, demokratik təsisatların fəaliyyətində və inkişafında iştirak etmək keyfiyyətlərinə malik müstəqil, yaradıcı şəxsiyyət və vətəndaş formalaşdırmaq | – təhsilalanların istedadlarının aşkar olunması və inkişafı; – təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alaraq innovativ təlim metodologiya-larından istifadə etmək | – əxlaqi cəhətdən inkişaf etmiş, yaradıcı şəxsiyyət olmaq; – pedaqoji prosesdə hər bir iştirakçının yerini görmək | – öz üzərinə məsuliyyət götürmək, kollegial qərarların qəbulunda, demokratik təsisatların fəaliyyətində və inkişafında iştirak etmək keyfiyyətlərinə malik müstəqil, yaradıcı şəxsiyyət və vətəndaş formalaşdırmaq | əməkdaşlıq, tədqiqatçılıq, özünütəhsil və idarəçilik bacarıqlarına malik olmaq | – əmək fəaliyyətində ixtisasa dair məsələləri həll etmək bacarığına malik olmaq; – peşə fəaliyyətində qarşıya çıxan məsələləri optimal həlletmə qabiliyyətinə malik olmaq | – kollektivdə işləmək; – problemli şəraitlərdə təşəbbüskarlıq göstərmək və məsuliyyəti öz üzərinə götürmək; – kollektivdə öz həmkarları ilə birgə işləməyi, optimal qərarlar qəbul etməyi bacarmaq |
| uyğun, əlaqəli məqamlar | – istedadının aşkar olunması və inkişafı; – innovativ təlim metodologiyalar ından istifadə | yaradıcı şəxsiyyət olmaq, prosesdə hər bir iştirakçının yerini görmək | – öz üzərinə məsuliyyət götürmək, kollegial qərarların qəbulunda, demokratik təsisatların fəaliyyətində və inkişafında iştirak etmək keyfiyyətlərinə malik müstəqil, yaradıcı şəxsiyyət və vətəndaş formalaşdırmaq | əməkdaşlıq, tədqiqatçılıq, özünütəhsil və idarəçilik bacarıqlarına malik olmaq | – ixtisasa dair məsələləri həll etmək, – qarışıya çıxan məsələləri optimal həll etmək | – kollektivdə işləmək; – problemli şəraitlərdə təşəbbüskarlıq göstərmək və məsuliyyəti öz üzərinə götürmək; – kollektivdə öz həmkarları ilə birgə işləməyi, optimal qərarlar qəbul etməyi bacarmaq |

də dünyada aparıcı alimlər və ictimai təşkilatlar qlobal səviyyədə kompetensiyaların hazırlanması istiqamətində öz axtarışlarını davam edirlər.

«Təhsil üçün XXI əsr kompetensiyaları» ifadəsi ötən əsrin sonu, əsrimizin əvvəllərində lüğətimizə daxil olub. Bu termin akademik, idraki, sosial, emosional və şəxsi kompetensiyaları əhatə edir. Buraya tənqidi düşünmə, problem həlletmə, əməkdaşlıq, səmərəli ünsiyyət, motivasiyalı olmaq, öyrənməyi öyrənmək, İKT savadı, yaradıcılıq, novatorluq, etik bacarıq və dəyərlər daxildir [Boyce et al., 2001; Curry and Sherry, 2004]. Bu kompe-

tensiyalarla bağlı müxtəlif çərçivələr müəyyən edilmişdir. 1996-cı ildə YUNESKO-nun Təhsil üzrə Beynəlxalq Komitəsi tərəfindən XXI əsr üçün kompetensiyalar çərçivəsi hazırlanmışdır [Delor 1996]. Çərçivə 4 prinsip üzrə sistemləşdirilmişdir: bilmək üçün öyrənmə, etmək üçün öyrənmə, olmaq üçün öyrənmə və birgə fəaliyyət üçün öyrənmə. Beləliklə, çərçivə sənədində 4 əsas sahə əhatə olunmuşdur: bilik, anlama, həyat üçün kompetensiyalar və fəaliyyət üçün kompetensiyalar.

Harvard Universitetində Dəyişən Liderlik Qrupu tərəfindən digər kompetensiyalar sistemi hazırlanmışdır. Vaqner göstərir ki, aprılan yüzlərlə sorğunun nəticəsində öyrənənlər XXI əsrdə həyata, iş yerlərinə və vətəndaşlığa hazır olmaq üçün qurtuluş imkanı verən yeddi əsas kompetensiyanı vurğulamışlar: tənqidi təfəkkür və problem həlli; əməkdaşlıq və liderlik; çeviklik və adaptasiya; təşəbbüskarlıq və sahibkarlıq; effektiv şifahi və yazılı nitq; informasiya əldə etmə və təhlil etmə; maraq və təsəvvür [Wagner, 2010, səh.4].

McLoughlin və Lee fərdiləşmə, əməkdaşlıq, ünsiyyət, qeyri-rəsmi təlim və məhsuldarlığı XXI əsr kompetensiyalarının əsas elementləri hesab edərək onları gələcək təhsilin açarı adlandırır [McLoughlin and Lee, 2008; Redecker and Punie, 2013].

XXI əsr Beynəlxalq Təhsil Komitəsi (1996), P21 (2007 a, 2007 b) Stenberq and Subotnik (2006), P21(2007a, 2008), Vaqner (2010), Faser (2009), Barry (2012), (Gardner 2008) və 24-ə qədər digər araşdırmada XXI əsr kompetensiyaları və əsas vərdişlər öyrənilmiş və müxtəlif şəkildə qruplaşdırılmışdır. Birləşmiş Millətlər Təşkilatının Avropa İqtisadi Komissiyası tərəfindən 7 aprel 2011-ci ildə təsdiq olunmuş Təhsildə Dayanıqlı İnkişaf üzrə müəllim təhsilinin Konseptual Çərçivəsi (UNECE modeli) araşdırılan problem baxımından diqqətəlayiqdir. Çərçivə sənədi hazırlanarkən Delor sistemi əldə rəhbər tutulmuşdur. Çərçivə sənədində dörd mərhələnin (bilmək üçün öyrənmə; etmək üçün öyrənmə; olmaq üçün öyrənmə; birgə fəaliyyətdə olmaq üçün öyrənmə) hər biri üzrə üç səviyyədə

Cədvəl 2. **Nüfuzlu beynəlxalq təşkilatlar tərəfindən təsdiq edilmiş, Delor sisteminə əsaslanan XXI əsr kompetensiyaları**

| Kompetensiya | Alt-kateqoriya |
|---|---|
| 1. Sosial-emosional vərdişlər | 1.1. Özünüdərketmə |
| | 1.2. Özünütənzimləmə |
| | 1.3. Sosial dərketmə |
| | 1.4. Sosial vərdişlər |
| | 1.4.1. Əməkdaşlıq |
| | 1.4.2. Vətəndaşlıq və sosial məsuliyyət |
| | 1.5. Qərar qəbuletmə |
| 2. Problem həlletmə | 2.1. Problem həlletmə |
| | 2.2. Tədqiqat vərdişləri |
| 3. Tənqidi düşünmə | |
| 4. Yaradıcılıq və İnnovasiya | |
| 5. İnformasiya savadlılığı | |
| 6. İKT savadlılığı | 6.1. İKT savadlılığının inkişaf etdirilməsi |
| | 6.2. İKT savadlılığının təlim və işin digər sahələrinə tətbiqi |
| 7. Öyrənməyi öyrənmə və metakoqnitiv vərdişlər | |
| 8. İş vərdişləri, sahibkarlıq və məhsuldarlıq | |
| 9. Həyati vərdişlər | 9.1. Sağlamlıq. Sağlam həyat tərzi |
| | 9.2. Ekoloji dərketmə |

kompetensiyalar müəyyən edilmişdir (holistik yanaşma: inteqrativ düşünmə və təcrübə; dəyişikliyi göz önündə canlandırma:dünən, bu gün və gələcək; dəyişikliyə nail olma: insanları, pedaqogikanı və təhsil sistemini).

UNİSEF-in dəstəyi ilə Monteneqro (2017) təhsil sistemində kurikulumların (o cümlədən müəllim təhsili kurikulumlarının) təhlilinə dair aparılan son araşdırmalarda da Delor çərçivəsindən faydalanılmışdır [Pešikan və Lolaviçin, 2017]. Kompetensiyalar çoxaspektliliyi ilə diqqəti cəlb edir: emosional vərdişlər, intellektual vərdişlər, sosial bacarıqlar, texnoloji bacarıqlar və gündəlik həyat vərdişləri. Çərçivədə kompetensiya və alt-kompetensiyalar aşağıdakı kimi təqdim edilmişdir (Cədvəl 2).

Cədvəl 3. **Təhsilverənlərin keyfiyyət göstəricilərinə dair müxtəlif sənədlərdə ifadə edilmiş tələb və kompetensiyaların XXI əsr kompetensiyaları ilə müqayisəsi**

| **XXI əsr Təhsil kompetensiyaları** / Hüquqi normativ sənədlər | Özünüdərketmə | Özünütənzimləmə | Sosial dərketmə | Sosial vərdişlər | Əməkdaşlıq | Vətəndaşlıq və sosial məsuliyyət | Qərar qəbuletmə | Problem həlletmə | Tədqiqat vərdişləri | Tənqidi düşünmə | Yaradıcılıq və innovasiya | İnformasiya savadlılığı | İKT savadlılığının inkişaf etdirilməsi | İKT savadlılığının təlim və işin digər sahələrinə tətbiqi | Öyrənməyi öyrənmə və metakoqnitiv vərdişlər | İş vərdişləri, sahibkarlıq və məhsuldarlıq | Sağlamlıq. Sağlam həyat tərzi | Ekoloji dərketmə | *Vərdişlərin əhatə olunma faizi* |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| **Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu** | | | ✓ | ✓ | | ✓ | ✓ | | | | ✓ | ✓ | ✓ | ✓ | ✓ | ✓ | | | **55 %** |
| **Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası** | | | | | | | | | | | ✓ | | | | ✓ | ✓ | | | **17 %** |
| **Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının Konsepsiya və Strategiyası** | | | ✓ | ✓ | | | | | | | ✓ | | | | | ✓ | | | **22 %** |
| **Ali təhsil pilləsinin dövlət standartı və proqramı** | | | ✓ | ✓ | | ✓ | ✓ | | | | ✓ | ✓ | ✓ | ✓ | ✓ | ✓ | | | **55 %** |
| **Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları** | | ✓ | ✓ | ✓ | ✓ | ✓ | | | ✓ | | ✓ | | | | ✓ | ✓ | | | **50 %** |
| **Bakalavriat təhsilinin məzmunu və təşkili Qaydaları** | | | | ✓ | | ✓ | | ✓ | | | | | ✓ | ✓ | | ✓ | | | **33 %** |
| **Bakalavriat səviyyəsinin ixtisas üzrə proqramı** (ibtidai sinif müəllimliyi ixtisası) | | ✓ | | ✓ | ✓ | ✓ | | ✓ | | | ✓ | | ✓ | ✓ | ✓ | ✓ | ✓ | | **61 %** |
| Əhatə olunan kompetensiyaların sayı | **0** | **2** | **4** | **6** | **2** | **5** | **2** | **2** | **1** | **0** | **6** | **2** | **4** | **4** | **5** | **7** | **1** | **0** | |

Qeyd edilən kompetensiyalardan çıxış edərək Azərbaycanda pedaqoji təhsillə əlaqəli bir sıra sənədlər tərəfimizdən təhlil edilmişdir. Buraya respublikada təhsilə dair aparıcı hüquqi-normativ sənədlər, müxtəlif pillə və səviyyələr üzrə təhsilin məzmununa verilən tələblər, təhsilalanlardan gözlənilən nəticələr və ya kompetensiyalar, təhsilverənlərin keyfiyyət göstəricilərini əks etdirən yeddi sənəd daxildir. Həmin sənədlərdə qeyd edilən nəticələrin müasir tələblərə cavab verməsi səviyyəsini öyrənmək və bu baxımdan sənədlər arasında əlaqəlilik və davamlılığın təmin olunması səviyyəsini aydınlaşdırmaq üçün təhlillər aparılmışdır (Cədvəl 3).

Cədvəldən göründüyü kimi, təhsilin məzmununu ifadə edən sənədlərdə həm müasir tələblərin qarşılanması, həm də əlaqəlilik baxımından təhsil pillələri və səviyyələr arasında boşluqların olduğu müəyyənləşmişdir. Təhsil sənədlərində belə boşluqların mövcudluğu ciddi boşluq kimi dəyərləndirilir [Executive Summary, 2017].

Tədqiqatları növbəti mərhələdə daha da

Cədvəl 4. **Bakalavriat səviyyəsinin «İbtidai sinif müəllimliyi» ixtisası üzrə Təhsil Proqramında təhsilin məzmununa və səviyyəsinə qoyulan minimum tələblərin XXI əsr Kompetensiyaları baxımından təhlili**

| **XXI əsr Təhsil kompetensiyaları** | | Özünüdərketmə | Özünütənzimləmə | Sosial dərketmə | Sosial vərdişlər | Əməkdaşlıq | Vətəndaşlıq və sosial məsuliyyət | Qərar qəbuletmə | Problem həlletmə | Tədqiqat vərdişləri | Tənqidi düşünmə | Yaradıcılıq və innovasiya | İnformasiya savadlılığı | İKT savadlılığının inkişaf etdirilməsi | İKT savadlılığının təlim və işin digər sahələrinə tətbiqi | Öyrənməyi öyrənmə və metakoqnitiv vərdişlər | İş vərdişləri, sahibkarlıq və məhsuldarlıq | Sağlamlıq. Sağlam həyat tərzi | Ekoloji dərketmə |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| **«İbtidai sinif müəllimliyi» ixtisası üzrə təhsilin məzmununa və səviyyəsinə qoyulan minimum tələblər** | Yalnız «bacarmalıdır» üzrə | 0 | 0 | 2 | 1 | 0 | 2 | 1 | 1 | 1 | 2 | 1 | 0 | 1 | 2 | 0 | 13 | 1 | 0 |
| | **Faizlə cəmi 26 m. tələb** | 0% | 0% | 8% | 4% | 0% | 8% | 4% | 4% | 4% | 8% | 4% | 0% | 4% | 8% | 0% | 50% | 4% | 0% |
| | «Bilməlidir», «bacarmalıdır», «yiyələnməlidir» parametrləri üzrə | 1 | 0 | 2 | 6 | 0 | 3 | 1 | 1 | 3 | 1 | 1 | 3 | 2 | 2 | 0 | 27 | 7 | 0 |
| | **Faizlə cəmi 79 m. tələb** | 1% | 0% | 3% | 8% | 0% | 4% | 1% | 1% | 0% | 1% | 1% | 4% | 3% | 4% | 0% | 34% | 9% | 0% |

dərinləşdirərək bakalavriat səviyyəsinin «İbtidai sinif müəllimliyi» ixtisası üzrə proqramında məzmun və səviyyəyə verilən minimum tələblər və ümumi təhsil pilləsinin dövlət standartları və fənn proqramları (kurikulumları) sənədində ibtidai təhsil səviyyəsinin sonunda gözlənilən nəticələr təhsil üçün XXI əsr kompetensiyaları baxımından təhlil edilmiş, əldə edilən nəticələr qarşılıqlı müqayisə edilmişdir.

«İbtidai sinif müəllimliyi» ixtisası üzrə proqramda iki əsas blok (ikinci blok üç alt-blokdan ibarətdir) üzrə 79 minimum tələb mövcuddur. Minimum tələblər əsas üç cür səciyyələndirilir: *bilməlidir; bacarmalıdır; yiyələnməlidir.* Minimum tələblərdən 27-si «bilməlidir», 27-si «bacarmalıdır», 25-i «yiyələnməlidir» bölməsinə aiddir. İki istiqamətdə aparılan təhlillərdə əvvəlcə «bacarmalıdır»a daxil olan minimum tələblər, sonra isə «bilməlidir»», bacarmalıdır», «yiyələnməlidir»ə aid bütün minimum tələblərin XXI əsr kompetensiyalarına uyğunluq səviyyəsi öyrənilmişdir (Cədvəl 4).

Təhlillər göstərir ki, təhsil üçün XXI əsr kompetensiyalarından (cəmi 18-dir) 6-sı «İbtidai sinif müəllimliyi» ixtisası üzrə «bacarmalıdır» bölməsində əksini tapmamışdır. Bu da ümumi kompetensiyaların 1/3-ni təşkil edir. Buraya özünüdərk, özünütənzimləmə kimi emosional vərdişlər, həmçinin əməkdaşlıq, informasiya savadlılığı, öyrənməyi öyrənmə və metakoqnitiv vərdişlər, ekoloji dərketmə daxildir. Sosial vərdişlər, qərar qəbuletmə, problem həlletmə, tədqiqat vərdişləri, yaradıcılıq və innovasiya, İKT savadlılığının inkişaf etdirilməsi, sağlamlıq, sağlam həyat tərzi kimi kompetensiyaların hər biri 1 dəfə olmaqla 7 minimum tələbdə ifadə edilmişdir ki, bu da sənəddə təqdim edilən bacarıqların 4 %-ni təşkil edir. Sosial dərketmə, vətəndaşlıq və sosial məsuliyyət, tənqidi düşünmə, İKT savadlılığının təlim işinə tətbiqi kimi kompetensiyalar isə 2 dəfə olmaqla 4 kompetensiyada

Cədvəl 5. **Ümumi təhsil pilləsinin dövlət standartları və fənn proqramları (kurikulumları) sənədində ibtidai təhsil səviyyəsinin sonunda gözlənilən nəticələr XXI əsr Kompetensiyaları baxımından təhlili**

| XXI əsr Təhsil kompetensiyaları | Özünüdərketmə | Özünütənzimləmə | Sosial dərketmə | Sosial vərdişlər | Əməkdaşlıq | Vətəndaşlıq və sosial məsuliyyət | Qərar qəbuletmə | Problem həlletmə | Tədqiqat vərdişləri | Tənqidi düşünmə | Yaradıcılıq və innovasiya | İnformasiya savadlılığı | İKT savadlılığının inkişaf etdirilməsi | İKT savadlılığının təlim və işin digər sahələrinə tətbiqi | Öyrənməyi öyrənmə və metakoqnitiv vərdişlər | İş vərdişləri, sahibkarlıq və məhsuldarlıq | Sağlamlıq. Sağlam həyat tərzi | Ekoloji dərketmə |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| İbtidai təhsil səviyyəsinin sonunda gözlənilən nəticələrlə | 1 | 0 | 3 | 5 | 1 | 2 | 1 | 0 | 1 | 1 | 1 | 4 | 1 | 0 | 0 | 1 | 2 | 2 |
| Faizlə cəmi 14 təlim nəticəsi | 7% | 0% | 21 % | 36 % | 7% | 14 % | 7% | 0% | 7% | 7% | 7% | 29 % | 7% | 0% | 0% | 7% | 14 % | 14 % |

əksini tapmışdır ki, bu, bacarıqların 8 %-ni təşkil edir. İş vərdişləri kompetensiyası 13 minimum tələbə aid edilmişdir. Bu da ümumi bacarıqların 50 %-ni təşkil edir.

Növbəti mərhələdə ümumi təhsil pilləsinin dövlət standartları və fənn proqramları (kurikulumları) sənədində ibtidai təhsil səviyyəsinin sonunda gözlənilən nəticələrin müasir tələblərə cavab verməsi vəziyyəti öyrənilərkən aşkar olmuşdur ki, özünütən-zimləmə, problem həlletmə, İKT savadlılığının təlim və işin digər sahələrində tətbiqi, öyrənməyi öyrənmə və metakoqnitiv vərdişlər kimi 4 kompetensiya ibtidai təhsil səviyyəsində gözlənilən nəticələr arasında yer almamışdır (Cədvəl 5).

Özünüdərketmə, əməkdaşlıq, qərar qəbuletmə, tədqiqat vərdişləri, tənqidi düşünmə, yaradıcılıq və innovasiya, İKT savadlılığının inkişaf etdirilməsi, iş vərdişləri kimi 8 kompetensiya ayrı-ayrı təlim nəticə-lərində hər biri bir dəfə ifadə edilmişdir. Vətən-daşlıq və sosial məsuliyyət, sağlamlıq, sağlam həyat tərzi və ekoloji dərketmə olmaqla 3 kompetensiyanın hər biri ayrı-ayrı nəticələrdə 2 dəfə ifadə edilmişdir. İnformasiya savadlılığı kompetensiyası 4, sosial vərdişlər kompetensiyası 5 təlim nəticəsində ifadə edilmişdir.

Gələcək müəllim və onların dərs deyəcəyi ibtidai sinif şagirdlərindən gözlənilən nəticələr müasir tələblər baxımından dəyərləndirildikdən sonra əldə edilən nəticələr qarşılıqlı müqayisə edilmişdir (Cədvəl 6).

Cədvəldən göründüyü kimi, ibtidai təhsil səviyyəsinin təlim nəticələrinin XXI əsr kompetnsiyalarına uyğunluq faizi «İbtidai sinif müəllimiliyi» ixtisası üzrə məzmuna verilən tələblə müqayisədə 2 halda bərabər (0%), 3 halda aşağı (1%-27% arasında), 13 halda yüksəkdir (4%-25%) (Diaqram 1).

Yəni təhsil proqramlarına əsasən gözlənilən nəticələr baxımından müəllimlər onlara öyrədilən bilik, bacarıq və vərdişləri şagirdlərə öyrətmək zərurəti qarşısında qalırlar. Belə əlaqəsizliklərin pedaqoji təhsilə iki məqamdan təsir göstərdiyi açıqlanmışdır: Birincisi, müəllimlər öz peşəkar hazırlıqlarında zəruri vərdişləri inkişaf etdirə bilmirlər. İkincisi isə, qeyd edilən vərdişlərə sahib olmayan müəllim onların əhəmiyyətini dərk etmədiyindən həmin bacarıqları öz şagirdlərinə də öyrətməyə qadir olmur və ya bunu vacib hesab etmir [Executive Summary, 2017].

Tədqiqatların növbəti mərhələsində bakalavriat səviyyəsinin «İbtidai sinif müəllimliyi» ixtisası üzrə ümumi xarakter daşıyan «Məzunun ixtisas kompetensiyaları»nın həmin ixtisas

Cədvəl 6. **Bakalavriat səviyyəsinin «İbtidai sinif müəllimliyi ixtisası» üzrə təhsil proqramında təhsilin məzmununa, səviyyəsinə qoyulan minimum tələblərin və ümumi təhsilin dövlət standartları və fənn proqramları (kurikulumları) sənədində ibtidai təhsil səviyyəsinin sonunda gözlənilən nəticələrin qarşılıqlı və XXI əsr kompetensiyaları baxımından təhlili**

| **XXI əsr Təhsil kompetensiyaları** | | Özünüdərketmə | Özünütənzimləmə | Sosial dərketmə | Sosial vərdişlər | Əməkdaşlıq | Vətəndaşlıq və sosial məsuliyyət | Qərar qəbuletmə | Problem həlletmə | Tədqiqat vərdişləri | Tənqidi düşünmə | Yaradıcılıq və innovasiya | İnformasiya savadlılığı | İKT savadlılığının inkişaf etdirilməsi | İKT savadlılığının təlim və işin digər sahələrinə tətbiqi | Öyrənməyi öyrənmə və metakoqnitiv vərdişlər | İş vərdişləri, sahibkarlıq və məhsuldarlıq | Sağlamlıq. Sağlam həyat tərzi | Ekoloji dərketmə |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| **«İbtidai sinif müəllimliyi» ixtisası üzrə təhsilin məzmununa və səviyyəsinə qoyulan minimum tələblər** | Yalnız «bacarmalıdır» üzrə | 0 | 0 | 2 | 1 | 0 | 2 | 1 | 1 | 1 | 2 | 1 | 0 | 1 | 2 | 0 | 13 | 1 | 0 |
| | **Faizlə cəmi 26 m. tələb** | 0% | 0% | 8% | 4% | 0% | 8% | 4% | 4% | 4% | 8% | 4% | 0% | 4% | 8% | 0% | 50% | 4% | 0% |
| | «Bilməlidir», «bacarmalıdır», «yiyələnməlidir» parametrləri üzrə | 1 | 0 | 2 | 6 | 0 | 3 | 1 | 1 | 3 | 1 | 1 | 3 | 2 | 2 | 0 | 27 | 7 | 0 |
| | **Faizlə cəmi 79 m. tələb** | 1% | 0% | 3% | 8% | 0% | 4% | 1% | 1% | 0% | 1% | 1% | 4% | 3% | 4% | 0% | 34% | 9% | 0% |
| **İbtidai təhsil səviyyəsinin sonunda gözlənilən nəticələrlə** | | 1 | 0 | 3 | 5 | 1 | 2 | 1 | 0 | 1 | 1 | 1 | 4 | 1 | 0 | 0 | 1 | 2 | 2 |
| **Faizlə cəmi 14 təlim nəticəsi** | | 7% | 0% | 21% | 36% | 7% | 14% | 7% | 0% | 7% | 7% | 7% | 29% | 7% | 0% | 0% | 7% | 14% | 14% |
| **Fərq** | | 6% | 0% | 18% | 28% | 7% | 10% | 6% | –1% | 7% | 6% | 6% | 25% | 4% | –4% | 0% | –27% | 5% | 14% |

üzrə təhsilin məzmun və səviyyəsinə verilən minimum tələblərdə xüsusiləşməsi və reallaşdırılması imkanları tərəfimizdən araşdırılmışdır. İxtisas proqramında məzunun 24 ixtisas kompetensiyası 79 məzmun üzrə minimum tələbdə spesifikləşmişdir. Sənəddə hər minimum tələbin konkret olaraq hansı kompetensiyaya aid olduğu aydın göstərilmədiyindən, kompetensiyaların reallaşdırılması üçün kreditlərin paylanması vəziyyətini müəyyən etmək mürəkkəbləşmişdir. Məsələyə aydınlıq gətirmək üçün sənəddə təqdim edilmiş minimum tələblər məzmun və fəaliyyət baxımından müvafiq kompetensiyalar üzrə qruplaşdırılmışdır. Bəzən bir minimum tələb ayrı-ayrı kompetensiyalara aid olan bir neçə tərkib hissədən ibarət olduğundan uyğun hissələr ayrılaraq aid olduğu kompetensiyalarla qruplaşdırılmışdır. Bu səbəbdən minimum tələbin sayı 79 olsa da, kompetensiyalarla uyğunluq halının sayı 92-yə yüksəlmişdir. Kompetensiyaların minimum tələbdə spesifikləşmə vəziyyəti aşağıda təqdim edilən cədvəldəki kimidir (Cədvəl 7).

«Gözlənilən nəticələrin keyfiyyəti böyük məqsədləri ifadə etmə səviyyəsi ilə ölçülür» [UNİSEF, 2017]. Bu baxımdan, aparılan təhlillər göstərmişdir ki, 8 kompetensiya heç bir mi-

Diaqram 1. **Cədvəl 5-ə dair diaqram**




nimum tələbdə əksini tapmamış, spesifikləşməmiş, onların reallaşdırılması üçün kredit və saat ayrılmamışdır. Dörd kompetensiya yalnız bir dəfə minimum tələbdə ifadə edilmişdir. Bəzən bir kompetensiyanın 30, digərinin 11 minimum tələbdə ifadə edildiyi hallarına da rast gəlinmişdir. Kompetensiyaların məzmun üzrə minimum tələblərdə mütənasib və balanslaşdırılmış şəkildə davam etdirilməsindəki mövcud boşluqlar, onların reallaşdırılması işinin də çətinləşməsinə zəmin yaratmışdır. Bu kimi hallar sənədin nəticəyönlülük baxımından sistemliliyini, habelə ardıcıllıq və davamlılıq prinsipləri baxımından da məqsədəuyğunluğunu müzakirə mövzusuna çevirir. Kompetensiya və minimum tələblər arasında əlaqələndirmələr aparılarkən, bəzən ümumi məzmun və fəaliyyətdən deyil, yalnız bir uyğun sözdən çıxış edilmişdir (Cədvəl 8).

Göründüyü kimi, bu minimum tələbdə pedaqoji kollekltivdə əməkdaşlıqdan və ya şagird kollektivində birgə fəaliyyətin təşkilindən söz getmir. Bununla belə, əlaqəli hal kimi qəbul edilmişdir ki, belə nümunələrin sayı az deyil.

Tez-tez yaxın, yaxud təkrarlanan minimum tələblərlə də qarşılaşmaq olur ki, bu da onun tətbiqində qeyri-müəyyənlik yaradır (Cədvəl 9).

Cədvəl 7. **Məzunun ixtisas kompetensiyasının məzmun və səviyyəyə qoyulan minimum tələbdə spesifikləşmə vəziyyəti**

| Məzunun ixtisas kompetensiyası | Məzmun üzrə minimum tələblərin sayı |
|---|---|
| **Ümummədəni kompetensiyalar** | |
| kollektivdə işləmək | 3 |
| digər sahələrin mütəxəssisləri ilə ünsiyyətdə olmaq | 0 |
| beynəlxalq arenada işləmək | 0 |
| hüquqi biliklərə və etik normalara yiyələnmək | 1 |
| sağlam həyat tərzini qoruyub saxlamaq | 2 |
| yeni ideyalar irəli sürmək və əsaslandırmaq | 0 |
| mədəniyyətlərarası dialoqa hazır olmaq | 1 |
| tənqid və özünütənqidə dözümlülük göstərmək | 0 |
| problemli şəraitlərdə təşəbbüskarlıq göstərmək və məsuliyyəti öz üzərinə götürmək | 0 |
| xarici dildə sadə mətnləri oxuyub tərcümə etmək və fikrini ifadə etmək | 3 |
| İKT-dən istifadə etməyi bacarmaq | 3 |
| öz inkişafına, peşəkarlığının artırılmasına daim çalışmaq | 0 |
| fikrini düzgün və yığcam ifadə etmək | 3 |
| **İstehsalat-pedaqoji sahəsi üzrə peşə kompetensiyaları** | |
| fəaliyyət sahəsinə aid olan fənlərin əsas problemlərini, onların konkret tətbiq sahələrini bilmək | 11 |
| peşə fəaliyyətində İKT-dən istifadə etmək | 1 |
| ixtisasla bağlı anlayış və terminlərin mənasını bilmək və tətbiq etmək | 7 |
| qarşıya müəyyən vəzifələr qoymağı, onları həll etməkdə müvafiq metodları seçməyi və tətbiq etməyi bacarmaq | 30 |
| şagirdlərin dərs prosesində istifadə etməsi üçün elmi-metodik və didaktik vəsait hazıramağı bacarmaq | 2 |
| **Təşkilatı-inzibatçılıq sahəsi üzrə peşə kompetensiyaları** | |
| qazanılmış bilik, bacarıq və vərdişlərə uyğun olaraq, təhsil sahələrində kompleks məsələlərin həllində iştirak etməyə hazır olmaq | 7 |
| fənnin tədrisi ilə bağlı bilikləri təqdim etmək və onları iş şəraitinə adaptasiya etmək | 3 |
| kollektivdə öz həmkarları ilə birgə işləməyi, optimal qərarlar qəbul etməyi bacarmaq, idarəetmə metodlarına yiyələnmək | 2 |
| şagirdlərin müəyyən qruplarına rəhbərliyi bacarmaq | 0 |
| **Pedaqoji sahə üzrə peşə kompetensiyaları** | |
| tədris materiallarının elmi əsaslarını bilmək və onu öyrətməyi bacarmaq | 1 |
| elekton kitabxanalardan, referativ jurnallardan, internetdən yeni məlumatları əldə etmək və təqdim etmək | 0 |
| **Cəmi** | **80** |
| Heç bir kompetensiyaya aid olmayan minimum tələblər | 7 |
| Qismən aid olan minimum tələblər | 5 |
| **Yekun** | **92** |

Cədvəl 8. **Məzunun ixtisas kompetensiyasının məzmun və səviyyəyə qoyulan minimum tələbdə spesifikləşməsinə dair nümunə**

| **Ümummədəni kompetensiyalar** | **Minimum tələblərin sayı** | **Minimum tələblər** |
|---|---|---|
| Kollektivdə işləmək | 3 | 1. Fövqəladə hallarda əhalinin, ərazinin mühafizəsini, kollektiv və fərdi mühafizə vasitələrini, xəstələrə ümumi qulluq qaydalarını, ilkin tibbi yardımın göstərilməsini bilmək;<br>2. Fövqəladə hallar və onların vəzifələrini, fövqəladə hallarda əhalinin mühafizəsinin əsas üsullarını, kollektiv mühafizə vasitələrini bilmək.<br>3. Fərdin və kollektivin psixoloji xarakteristikasını tərtib etmək bacarığına yiyələnmək. |

Cədvəl 9. **Məzmun və səviyyəyə qoyulan minimum tələblərdə təkrarçılıq və qeyri-müəyyənliyə dair nümunə**

| **Bilməlidir** | **Bacarmalıdır** | **Yiyələnməlidir** |
|---|---|---|
| — müasir Azərbaycan ədəbi dilinin fonetik, leksik, qrammatik, orfoepik və orfoqrafik normalarını;<br>— ana dilinin qrammatikasını, yazı qaydalarını. | — müasir azərbaycan ədəbi dilində düzgün danışmağı və yazmağı;<br>— Azərbaycan dilinin qrammatikasını və yazı qaydalarını öyrətməyi. | — müasir Azərbaycan dilinin fonetik, leksik, qarammatik və ədəbi tələffüz və orfoqrafiya normalarına uyğun danışmaq və yazmaq bacarığına. |
| — ana dili dərslərində istifadə olunan metod, priyom, yol və vasitələri, şagirdlərdə nitq inkişafı üzrə müvafiq vərdişlərin aşılanması yollarını. | — ana dili dərslərində istifadə olunan başlıca metod, üsul, yol, əyani və texniki vasitələrdən, fəal təlimdən, interaktiv metodlardan istifadəni;<br>— ana dilinin tədrisi üçün müvafiq metod və vasitələri müəyyənləşdirməyi. | — müasir Azərbaycan dilinin fonetikası, leksikologiyası, morfologiyası, sintaksisi barədə dərin biliyə, düzgün oxu və yazı qaydaları ilə bağlı vərdişlərə;<br>— ana dili dərslərində istifadə olunan başlıca metodlara, o cümlədən interaktiv metodlara, sinifdənxaric və məktəbdənkənar işlərin təşkili metodikasına. |

Bununla belə, bu sənəd ali təhsil pilləsinin bakalavriat səviyyəsində təsdiq olunmuş ilk nəticəyönlü təhsil proqramıdır və məzmun üzrə minimum tələblərin tətbiqi pedaqoji təhsili təşkil edən ali təhsil müəssisələrinin sənədlərində, xüsusilə də fənlər üzrə işçi-tədris proqramlarında (sillabus) izlənməsi və tətbiqi əsas vəzifələrdəndir.

Tədqiqatın növbəti mərhələsində ixtisas üzrə məzmun və səviyyəyə verilən minimum tələblərin tətbiqi vəziyyətini öyrənmək məqsədi ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin 2014/2015-ci dərs ili üzrə tədris planları təhlil edilmişdir. Tədris planlarında «Nəzəri təlimə» 105 həftə ayrıldığı göstərilmişdir. Bununla belə, «İbtidai sinif müəllimliyi» ixtisası üzrə əsas və seçmə fənn bloku daxil olmaqla tədris edilən 51 fənnin neçəsinin nəzəri (akademik biliklər), neçəsinin metodik (müxtəlif istiqamətlərdə işin təşkili yollarına dair biliklər) və neçəsinin praktik (bacarıqlar) xarakter daşıdığı tərəfimizdən araşdırılmışdır (Cədvəl 10).

Təhlillər göstərir ki, tədris edilən fənlərin

Cədvəl 10. **2014/2015-ci dərs ili üzrə tədris planlarında tədrisi nəzərdə tutulan fənlərin təsnifatı**

| Fənlərin tədris məqsədi | Fənlərin sayı | Ümumi fənlərin faizi | Kreditlərin sayı | Kreditlər (faizlə) |
|---|---|---|---|---|
| Metodik | 13 | 25,49 % | 55 ± 4 | 26,19 % ± 1,9 % |
| Nəzəri | 35 | 68,62 % | 138 ± 13 | 65,71 % ± 6,19 % |
| Praktik | 3 | 5,88 % | 4 ± 9 | 1,9 % ± 4,28 |
| **Cəmi** | **51 fənn** | | **210 kredit** | |

Cədvəl 11. **Tədris vaxtının auditoriya və pedaqoji təcrübə arasında səmərəli bölgüsünə dair 2002-ci ildə Azərbaycanda çalışmış beynəlxalq məsləhətçi Rob Mak Braydın tövsiyəsi**

| Dövr | Məktəblərdə keçirilən vaxt, % | Universitetlərdə keçirilən vaxt, % |
|---|---|---|
| Birinci il | 10 | 90 |
| İkinci il | 20 | 80 |
| Üçüncü il | 35 | 65 |
| Dördüncü il | 60 | 40 |

35-i (68,62%) nəzəri, 13-ü (25,49%) metodik, 3-ü (5,88%) praktik xarakter daşıyır. Yəni «ibtidai sinif müəllimliyi» ixtisası üçün ayrılmış 210 kreditin 65,71% ± 6,19%-i (138 kredit ±13kredit) nəzəri biliklərin tədrisinə, 26,19%±1,9%-i (55 kredit±4kredit)i metodik biliklərin tədrisinə, 1,9%±4,28-i (4kredit ±9kredit)i praktik bacarıqların tədrisinə ayrılmışdır. *(Qeyd: Seçmə fənn bloklarında eyni blokda verilən iki fəndən birinin metodik, digərinin nəzəri xarakter daşıdığnı nəzərə alaraq kreditlər hesablanarkən «±» istifadə edilmişdir).*

Belə qənaətə gəlmək olur ki, 2002-ci ildə Rob Mak Braydın qeyd etdiyi «Pedaqoji təhsilin daha çox psixoloji, metodoloji və pedaqoji nəzəriyyələrin üzərində qurmağa üstünlük verildiyi və nəzəri biliklərə gərəyindən artıq qiymət verildiyi» problemi hələ də aktual olaraq qalır.

Tədris planlarında həmçinin pedaqoji təcrübəyə 4-cü kursda 14 həftə ayrıldığı müşahidə edilmişdir. Hələ 2002-ci ildə Rob Mak Brayd bu problemi xüsusilə vurğalayaraq müəllim hazırlığının ilk ilindən gələcək müəllimlərin məktəblə təmasının qurulmasının zəruri olduğunu vurğulamış və bunu reallaşdırmağın işlək bir planını da təqdim etmişdir (Cədvəl 11).

Göründüyü kimi, tələbə ilk üç il ərzində vaxtının əsas hissəsini universitetlərdə keçirməli, lakin ümumtəhsil məktəblərinə də baş çəkməlidir. Sonuncu il isə o, vaxtının əsas hissəsini məktəblərdə keçirməli və zəruri hallarda universitetə də getməlidir [Mak Brayd, 2002]. YUNESKO-nun Myanmarda (STEM) ilkin müəllim hazırlığının gücləndirilməsi layihəsi [YUNESKO,2016] çərçivəsində də pedaqoji təcrübənin 4 il ərzində paylaşdırıldığı müşahidə edilir (Cədvəl 12).

Ən son dövrdə işlənmiş bu layihədə 4 il ərzində mərhələli şəkildə keçirilən təcrübədə aparılan iş illik qiymətləndirmənin 50 %-ni təşkil edir [YUNESKO, Myanmar, 2016]. ADPU-nun 2014 və 2015-ci il tədris planları ilə müqayisədə təcrübə həftəsinin sayı 18 həftə azdır və mərhələli xarakter daşımır.

Tədqiqatın növbəti mərhələsində «İbtidai sinif müəllimliyi» ixtisası üzrə əsas və seçmə fənlərə aid əldə edilməsi mümkün olmuş 14 sillabus əvvəlcə XXI əsr kompetensiyaları baxımından nəzərdən keçirilmiş, müasir tələblər baxımından dəyərləndirilmişdir (Cədvəl 13).

Əlaqələndirmələr aparılarkən həm fənlərin məqsəd və gözlənilən nəticələri, həm də mövzulara diqqət yetirilmişdir. Qeyd edilməlidir

Cədvəl 12. **YUNESKO-nun Myanmarda (STEM) ilkin müəllim hazırlığının gücləndirilməsi Layihəsi (Unesco,2016) çərçivəsində 4 illik təlim və tədris təcrübəsi**

| **Tədris və təlim təcrübəsi** | | | | |
|---|---|---|---|---|
| **Dövr** | | **Təcrübənin növü** | **Gün** | **Həftə** |
| Birinci il | Semestr — 1 | Məktəb müşahidələri, bir şagirdlə iş | 5 | 5 ay ərzində |
| | | Şagirdlər qrupu ilə iş | 10 | 2 ayrı həftə |
| | Semestr — 2 | Şagirdlər qrupu ilə iş | 15 | 3 ayrı həftə |
| İkinci il | Semestr — 3 | Qismən müstəqil fəaliyyət | 25 | 5 ardıcıl həftə |
| | Semestr — 4 | Qismən müstəqil fəaliyyət | 25 | 5 ardıcıl həftə |
| Üçüncü il | Semestr — 5 | Tam müstəqil fəaliyyət | 15 | 3 ardıcıl həftə |
| | Semestr — 6 | Tam müstəqil fəaliyyət | 15 | 3 ardıcıl həftə |
| Dördüncü il | Semestr — 7 | Tam müstəqil fəaliyyət | 40 | Yarım semestr (7 həftə) |
| | Semestr — 8 | Şagird qrupları ilə iş | 20 | 4 ardıcıl həftə |
| **Cəmi** | | | **170 gün** | **32 həftə** |

ki, «Müəllim ustalığına giriş», «Pedaqogika», «Təhsilin idarə edilməsi», «Təlim nəticələrinin qiymətləndirilməsi» fənlərinin sillabuslarında texniki səbəblərdən tədrisin nəticəsi aşkar edilmədiyindən tədris edilən mövzulardan çıxış edərək təhlillər aparılmış və 18 kompetensiyanın heç biri ilə hər hansı bir əlaqə müəyyən etmək mümkün olmamışdır. «Həyat fəaliyyətinin təhlükəsizliyi» və «Həyat bilgisi və onun tədrisi metodikası» fənlərinin hər birində ayrı-ayrı iki kompetensiyanın ifadə edildiyi müəyyən edilmişdir. «Qiymətləndirmə nəticələrindən istifadə və hesabatvermə», «Texnologiyanın tədrisi metodikası», «Həyat bilgisi» və «Texnologiya və onun tədrisi metodikası» (fərqli müəllimlərin sillabusları) fənləri üzrə sillabusların hər birində 4 ayrı-ayrı kompetensiyanın reallaşdırılması imkanı qeyd edilmişdir. Bir fənn sillabusunda («Müasir təhsil texnologiyaları») yeddi, digərində isə («Təhsilin əsasları») səkkiz kompetensiyanın tətbiqinə imkanların olduğu müəyyən edilmişdir.

Araşdırmaların əvvəlki mərhələsində minimum tələblərin ixtisas kompetensiyaları və XXI əsr kompetensiyaları baxımından aparılan təhlillərin davamı olaraq ixtisas üzrə məzmuna verilən minimum tələblərin sillabuslarda spesifikləşməsi və reallaşdırılması vəziyyəti öyrənilmiş, nəticəyönlü planlaşdırmanın keyfiyyəti dəyərləndirilmişdir. Hər bir müəllim tədris etdiyi fənn üzrə gözlənilən nəticələri müəyyənləşdirərkən məzmuna verilən tələbləri nəzərə almalıdır. «Təhsil məqsədlərinin əhəmiyyətli elementi olan kompetensiyaların reallaşdırılmasını təmin etmək üçün məqsəd və nəticələr daha dəqiq müəyyən edilməlidir» [UNİSEF, Mantenegro, 2017].

«Texnologiya və onun tədrisi metodikası» üzrə tədris nəticələri 5, digər müəllimin tərtib etdiyi eyniadlı sillabus üzrə 3, «Həyat bilgisi» fənni üzrə tədris nəticələri 6, «Həyat fəaliyyətinin təhlükəsizliyi» üzrə tədris nəticələrinin 3, «Təlim nəticələrinin qiymətləndirilməsi» və «Təhsilin əsasları» üzrə tədris nəticələrinin 1 minimum tələblə əlaqəli olduğu müəyyən edilmişdir. Yuxarıda qeyd edildiyi kimi dörd fənn sillabusunda tədris nəticələri aşkar edilmədiyindən mövzulara əsasən təhlillər aparılmışdır. Müəyyən edilmişdir ki, pedaqogika fənninin məzmunu 4 minimum tələblə qismən əlaqəlidir. Digər üç fənnin (Müəllim ustalığına giriş, Sosial pedaqogika və Pedaqogika) minimum tələblərlə əlaqəliliyi

Cədvəl 13. **«İbtidai sinif müəllimliyi» ixtisası üzrə əsas və seçmə fənlərə aid sillabuslarda fənn üzrə gözlənilən nəticələr və XXI əsr kompetensiyalarının müqayisəli təhlili**

| | **Fənlər** | | **Semestr** | Özünüdərketmə | Özünütənzimləmə | Sosial dərketmə | Sosial vərdişlər | Əməkdaşlıq | Vətəndaşlıq və sosial məsuliyyət | Qərar qəbuletmə | Problem həlletmə | Tədqiqat vərdişləri | Tənqidi düşünmə | Yaradıcılıq və innovasiya | İnformasiya savadlılığı | İKT savadlılığının inkişaf etdirilməsi | İKT savadlılığının təlim və işin digər sahələrinə tətbiqi | Öyrənməyi öyrənmə və metakoqnitiv vərdişlər | İş vərdişləri, sahibkarlıq və məhsuldarlıq | Sağlamlıq. Sağlam həyat tərzi | Ekoloji dərketmə | **Cəmi** |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| 1 | Müəllim ustalığına giriş | Seçmə fənn | **I** | | | | | | | | | | | | | | | | | | | **0** |
| 2 | Sosial pedaqogika | Seçmə fənn | **I** | | | ✓ | | | | | | | | | | | | | | | | **1** |
| 3 | Həyat fəaliyyətinin təhlükəsizliyi | | **I** | | | | | | ✓ | | | | | | | | | | | ✓ | | **2** |
| 4 | Pedaqogika | Əsas fənn | **II** | | | | | | | | | | | | | | | | | | | **0** |
| 5 | Təhsilin əsasları | | **II** | | | | ✓ | | | | | ✓ | ✓ | ✓ | ✓ | ✓ | | ✓ | | | | **7** |
| 6 | Pedaqogika | Əsas fənn | **III** | | | | | | | | | | | | | | | | | | | **0** |
| 7 | Qiymətləndirmə nəticələrindən istifadə və hesabat vermə | | **III** | | | | | | | | ✓ | ✓ | ✓ | | ✓ | | | | | | | **4** |
| 8 | Texnologiyanın tədrisi metodikası | Əsas fənn | **V** | | | | ✓ | | ✓ | | ✓ | | | ✓ | | | | | | | | **4** |
| 9 | Müasir pedaqoji texnologiyalar | Seçmə fənn | **V** | | | ✓ | | ✓ | | | ✓ | | ✓ | ✓ | ✓ | | | | ✓ | | | **7** |
| 10 | Təhsilin idarə edilməsi | | **VII** | | | | | | | | | | | | | | | | | | | **0** |
| 11 | Həyat bilgisi və onun tədrisi metodikası | Əsas fənn | **VII** | | | ✓ | | | | | | | | | | | | | | | ✓ | **2** |
| 12 | Həyat bilgisi | Əsas fənn | **VII** | | | | ✓ | | ✓ | | ✓ | | | | ✓ | | | | | | | **4** |
| 13 | Təlim nəticələrinin qiymətləndirilməsi | | **–** | | | | | | | | | | | | | | | | | | | **0** |
| 14 | Texnologiya və onun tədrisi metodikası | Əsas fənn | **VII** | | | | ✓ | | | | | | | ✓ | | ✓ | | | ✓ | | | **4** |
| | **Cəmi** | | | **0** | **0** | **2** | **4** | **2** | **2** | **0** | **4** | **2** | **3** | **4** | **4** | **2** | **0** | **1** | **1** | **2** | **1** | |

müəyyən edilmədi. Eləcə də «Qiymətləndirmə nəticələrindən istifadə və hesabatvermə» fənninin tədrisin nəticələrindən məzmuna verilən minimum tələblərlə əlaqəsinin olmadığı aşkar oldu. Qalan fənlərin 3-4 minimum tələblə qismən və səthi əlaqəsi müşahidə edildi. Nəzərə alınmalıdır ki, ixtisas üzrə məzmuna verilən minimum tələbin sayı 79-dur. Aşkar edilmiş əlaqəlilik 0-6 arasında dəyişir ki, buraya qismən və səthi əlaqələr də daxildir.

Fənlərin məzmuna verilən minimum tələblərlə əlaqəlilik vəziyyətinin minimum səviyyədə olması iki cür izah edilə bilər:

1. Müəllimlərin nəticəyönlü planlaşdırma bacarıqlarının aşağı olması və ya olmaması;

2. İxtisas üzrə minimum tələblərin tərtibinin nöqsanlı olması, həddən artıq spesifikləşməsi və bununla da müəllimlərin daha çox sayda minimum tələbin reallaşdırma imkanlarını məhdudlaşdırması.

Birinci məsələ ilə bağlı ADPU rəhbərliyinə müraciət edilmiş, razılıq alınandan sonra universitetin müxtəlif kafedralarının İbtidai təhsil fakültəsində dərs deyən 19 əməkdaşı işdənkənar vaxtda könüllülük əsasında 25 saatlıq təlimlərə cəlb edilmişdir. «Pedaqoji kadr hazırlığına verilən minimum tələblər və onların sillabuslarda planlaşdırılması texnologiyaları» mövzusunda keçirilən bu treninqin əsas məqsədi nəticəyönlü planlaşdırmanın texnologiyasının öyrənilməsi olmuşdur. Təlimin sonunda qiymətləndirmə aparılmışdır (Cədvəl 14).

Təhlillər göstərir ki, ixtisas üzrə məzmuna verilən minimum tələblər hər fənn üzrə həddən artıq spesifikləşdirilmişdir. Hər bir fənn üzrə metodikanın tədrisi məsələlərini əks etdirən minimum tələblərin sayı «bilir»,» bacarır», «yiyələnir» bölmələri üzrə 25-dir. Ayrı-ayrı fənlərin nəzəri əsaslarının elementlərini əhatə edən minimum tələblərin sayı da 25-ə bərabərdir. Ümumpedaqoji məsələlərə dair minimum tələblərin sayı 14-dür və həmin tələblərdə yuxarıda göstərilən 50 spesifikləşdilimiş minimum tələb ümumi şəkildə ifadə edilir. «Fənnin ümumi nəzəri əsaslarını və tədrisi metodikasını, fənn üzrə təlimin məzmunu və təşkili prinsiplərini, tərbiyə işlərinin metodikasını» bilir, «pedaqoji situasiya və fənnin spesifik xüsusiyyətləri nəzərə alınmaqla təlim məşğələləri aparmağı, fənlərarası əlaqələr qurmağı, təlim prosesində İKT-dən istifadə etməyi», «tədris materialını planlaşdırmağı, dərsin tipini, fənnin tədrisi üçün metod və vasitələri müəyyənləşdirməyi» bacarır kimi bir minimum tələb hər fənnə aid edilərək tətbiq edilə bilər. Bakalavriat səviyyəsinin ixtisas üzrə proqramı («ibtidai sinif müəllimliyi» ixtisası) sənədindən bəzi nümunələr:

*Bacarır:*

• musiqinin tədrisi üçün müvafiq metod və vasitələri müəyyənləşdirməyi;

• təsviri sənətin tədrisi üçün müvafiq metod və vasitələri müəyyənləşdirməyi;

• fiziki tərbiyənin tədrisi üçün müvafiq metod və vasitələri müəyyənləşdirməyi;

• texnologiya fənninin tədrisi üçün müvafiq metod və vasitələri müəyyənləşdirməyi, kağız, karton, plastirinlə işləməyi, müəyyən fiqurlar, güllər, bəzək əşyaları düzəltməyi.

*Yiyələnir:*

• ana dili dərslərində istifadə olunan başlıca metodlara, o cümlədən interaktiv metodlara, sinifdənxaric və məktəbdənkənar işlərin təşkili metodikasına;

• riyaziyyatın ibtidai kursuna aid çalışmaları həll etmək bacarığına;

• riyaziyyat dərslərində istifadə olunan başlıca metodlara, o cümlədən interaktiv metodlara, sinifdənxaric və məktəbdənkənar işlərin təşkili metodikasına;

• informatika dərslərində istifadə olunan başlıca metodlara, interaktiv metodlara, sinifdənxaric və məktəbdənkənar işlərin təşkili metodikasına;

• canlı və cansız təbiətdə baş verən dəyişikliklər, su, bitkilər və heyvanlar aləmi haqqında biliklərin tədrisi metodikasına.

Minimum tələbin bu qədər spesifikləşməsi sənəddə sistemsizlik, qarışıqlıq yaradır, onun tətbiqinə yaradıcı yanaşmağı xeyli çətinləşdirir.

Cədvəl 14.

**ADPU-nun İbtidai təhsil fakültəsində dərs deyən müxtəlif kafedraların əməkdaşlarına «Pedaqoji kadr hazırlığına verilən minimum tələblər və onların sillabuslarda planlaşdırılması texnologiyaları» mövzusunda keçirilən təlimin nəticələri**

| Suallar | | | Beş ballıq şkala üzrə | | | | | | | | | | Keyfiyyət faizi | İştirakçıların sayı |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | | 1 | 2 | 3 | 4 | 5 | | 3 | 4 | 5 | | | |
| | | | Qiymətləndirənlərin sayı | | | | | Qiymətlən-dirməyənlər | Qiymətləndirənlər (faizlə) | | | Qiymətlən-dirməyənlər | | |
| Treninqin məzmunu nə qədər məqsədəuyğun idi? | | | | | | 1 | 17 | 1 | | 5,26 % | 89,47 % | 5,26 % | 94,74 % | 19 |
| Treninqdə istifadə edilən resurslar nə qədər məqsədəuyğun idi? | | | | | | 3 | 15 | 1 | | 15,79 % | 78,95 % | 5,26 % | 94,74 % | 19 |
| Təlim prosesi nə qədər səmərəli təşkil edilmişdir? | | | | | | 2 | 15 | 2 | | 10,53 % | 78,95 % | 10,53 % | 89,47 % | 19 |
| Belə təlimlərin silsilə xarakterli olmasını istərdinizmi? | | | | | | | 18 | 1 | | 0,00 % | 94,74 % | 5,26 % | 94,74 % | 19 |
| Təlim sizin üçün hansı səviyyədə səmərəli oldu? | | | | | 1 | 2 | 15 | 1 | 5,26 % | 10,53 % | 78,95 % | 5,26 % | 89,47 % | 19 |
| Nə öyrəndiniz? Qısa təsvir edin | Standartların fənlər üzrə təyinatını, Sillabusun düzgün tərtibini, düzgün planlaşdırmasını öyrəndim | 13 | | | | | | | | | | | | 19 |
| | Kadr hazırlığı ilə bağlı qanunverici sənədləri | 5 | | | | | | | | | | | | |
| | Heç nə öyrənmədim | 1 | | | | | | | | | | | | |
| Öyrəndiklərinizi hansı səviyyədə tətbiq edə biləcəksiniz? Səbəbi göstərin | | | | | 2 | 8 | 7 | 2 | 10,53 % | 42,11 % | 36,84 % | 10,53 % | 78,95 % | 19 |

**Təkliflər.** Belə treninqlərin mütəmadi və ya silsilə xarakterli olması, başqa müəllimlərə, rəhbərlərə, tədris planını tərtib edən insanlara da keçirilməsi təklif edilir. Bildirilir ki, treninqlər eyni ixtisaslı müəllimlərə ayrılıqda keçirilsin, sertifikat verilsin, minimum tələblərin təkmilləşdirilməsinə ali məktəb müəllimləri cəlb edilsin.

## Gəlinmiş nəticələr və onlarla bağlı təkliflər

1. Təhsilin məzmunu və tədrisin təşkilinə dair siyasəti müəyyən edən sənədlərdə nəticəyönlülük, ardıcıllıq və sistemlilik baxımından boşluqlar müşahidə edilir. Təhsilin ümumilikdə məzmunu və təşkili, ayrılıqda isə hər bir kompetensiyasının reallaşdırılması baxımından sistemlərarası və sistemdaxili, pillə və səviyyələrarsı, eləcə də pillə və səviyyələrdaxili mükəmməl sistemli planlaşma təhsilin keyfiyyətinin yüksəldilməsinə zəmanət verir. Həmin boşluqların aradan qaldırılması həm də hesabatlılığın təmin edilməsi baxımından əhəmiyyətlidir.

2. Ali təhsil standartlarında müəyyən edilmiş kompetensiyalar, həmçinin bütün səviyyə və pillələrdə təhsilin məzmunu və tədrisin təşkilinə verilən tələblərə XXI əsr kompetensiyaları, habelə digər elmi araşdırmalar və siyasi sənədlər nəzərə alınmaqla yenidən baxılması real ehtiyacdır. İşçi qruplarda silsilə sənədlərin ümumidən xüsusiyə doğru ardıcıllıq və davamlılıq gözlənilməklə öyrənilməsi və təkliflərin hazırlanması təklif edilir.

3. İxtisaslar üzrə tədris proqramları və planları işlənən zaman minimum tələblərin reallaşdırlması üçün müəyyən edilmiş fənlər, onların məqsədi və tədris nəticələrinin dəqiq müəyyən edilməsi, kreditlərin balanslaşdırılmış bölünməsini təmin edər.

3. Pedaqoji təcrübələrə ayrılan vaxtın az olması və sistemli təşkil edilməməsi səbəbindən gələcək müəllimin real məktəb şəraitində şagirdlərlə, həmkarlarla, valideynlərlə, rəhbərliklə iş təcrübəsi inkişaf etdirilə bilmir. Buna görə də pedaqoji təcrübənin balanslaşdırılmış və düşünülmüş şəkildə I-VIII semestrlər arasında paylaşdırılması təklif edilir.

5. Tətbiq səviyyəsində nəticəyönlü və səmərəli planlaşmanın aparılması və tədrisin uğurlu təşkilinə nail olmaq üçün ali təhsil müəssisələrinin rəhbər işçilərinin və müəllim heyətinin xüsusi təlimlərə cəlb edilməsi tövsiyə olunur.

### İstifadə edilmiş ədəbiyyat


1. Ali təhsil müəssisələrinin bakalavriat və magistratura səviyyələrində kredit sistemi ilə tədrisin təşkili Qaydaları.
2. Ali təhsil pilləsinin dövlət standartı və proqramı.
3. Ali və orta ixtisas təhsili müəssisələrinin attestasiyası və akkreditasiyası haqqında Əsasnamə.
4. Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının Konsepsiya və Strategiyası.
5. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası.
6. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasının həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı.
7. Bakalavriat səviyyəsinin ixtisas üzrə proqramı (ibtidai sinif müəllimliyi ixtisası).
8. Bakalavriat təhsilinin məzmunu və təşkili Qaydaları.
9. Boyce, G., Williams, S., Kelly, A., Yee, H. (2001). Fostering deep and elaborative learning and generic (soft) skill development: the strategic use of case studies in accounting education. Accounting Education 10 (1), 37-60.
10. Course and syllabus design, Univercity of Washington, http://www.washington.edu/teaching/teaching- resources /preparing-to-teach/ designing-your-course-and-syllabus /
11. Cynthia Luna Scott. The futures of learning 2: What kind of learning for the 21st century?
12. Education for Life: Key 21st Century Competencies in Curricula in Montenegro — Executive Summary. 2017, sah.15
13. Education Research and Foresight, Paris, 2015 (ERF Working Papers Series, No.14).
14. McKinsey and Co. (2007), How the world's best performing school systems come out on top, London.

15. Müəllimlərin etik davranış Qaydaları.
16. O'Brien, J. G., Millis, B. J., & Cohen, M. G. (2008). The course syllabus: A learning-centered approach.
17. P.O. Box 967, Prakanong Post Office, Bangkok 10110, Thailand.
18. Part I Volume 1 Key Concepts in Education Policy Analysis: UNESCO Handbook on Education Policy Analysis and Programming, UNESCO, 2013.
19. Pesikan A., Lalovic Z. (2017). Education for life: Key 21st century competencies in curricula in Montenegro, Executive summary, Buro for Education Services of Montenegro.
20. San Francisco, CA: Jossey-Bass.
21. «Təhsil haqqında» Azərbaycan Respublikasının Qanunu.
22. Təhsil sahəsinə aid olan qulluqçu vəzifələrinin Vahid Tarif-İxtisas Sorğu Kitabçası.
23. The Competences in Education for Sustainable Development («Learning for the future: Competences in Education for Sustainable Development»; ECE/CEP/AC.13/2011/6) were adopted at the sixth meeting of the United Nations Economic Commission for Europe (UNECE) Steering Committee on Education for Sustainable Development on 7 April 2011.
24. UNESCO, 1991, Principal Regional Office for Asia and the Pacific.
25. Ümumi təhsil pilləsinin dövlət standartları və proqramlar.
26. Vadi D., Hadad, Terri. (1995). Demskinin köməkliyi ilə Təhsilin planlaşdırılmasının əsasları. Təhsil siyasəti, planlşdırma prosesi: tətbiqi çərçivə, UNESCO: Təhsilin Planlaşdırılması üçün Beynəlxalq İnstitut, Paris.
27. Wagner, T. (2010). Overcoming The Global Achievement Gap (online). Cambridge, Mass., Harvard University.